WIKIPEDIA

# Akan dili

Vikipediya, azad ensiklopediya

| Akan dili | |
|---|---|
| **Orijinal adı** | akan<br>Akan |
| **Ölkələr** | Qana |
| **Danışanların ümumi sayı** | 8.314.600 ± 100 nəf. (2004)[1] |
| **Təsnifatı** | |
| Niger-Congo languages<br>Atlantic–Congo languages<br>Volta–Congo languages<br>Kwa languages<br>Nyo languages<br>Potou–Tano languages<br>Central Tano languages<br>Akan dili | |
| **Yazı** | Latın əlifbası |
| **Dil kodları** | |
| **QOST 7.75–97** | ака 027 |
| **ISO 639-1** | ak (https://id.loc.gov/vocabulary/iso639-1/ak) |
| **ISO 639-2** | aka (https://iso639-3.sil.org/code/aka) |
| **ISO 639-3** | aka (https://iso639-3.sil.org/code/aka) |
| **Dilin strukturlarının dünya atlası** | akn (http://wals.info/languoid/lect/wals_code_akn) |
| **Ethnologue** | aka (https://www.ethnologue.com/language/aka) |

**Akan dili** – akanların dillərindən biridir. Mərkəzi və Cənubi Qanada yayılmışdır. Bu dildə 7 milyondan artıq adam danışır. Akan Dili *kva* dillərinin *tano* qolunun mərkəzi qrupuna aiddir və qohum *abron* dili ilə birlikdə akan yarımqrupunu təşkil edir. Daha geniş mənada "Akan" termini elmi ədəbiyyatda tano qolunun ümumi adı kimi işlədilmişdir və bu, hazırda akan xalqlarının adında saxlanılmaqdadır. Bu termindən çvi birliyinin adı kimi də istifadə olunmuşdur. Akan Dilindəki sait səslərə yüksəkliyinə görə çarpazlaşmış tipli ahəngdarlıq xasdır. Arxa damaq samitinin olmaması və ön palatal samitlərin (ky, gy, hy) dodaqlanan cütlüklərlə (tw, dw, hw) mövcud- luğu bu dil üçün səciyyəvidir. Akan Dilində qrammatik və leksik əhəmiyyətli 2 yumşaq ahəng var. Adlar tək və cəm kateqoriyalara ayrılır. Sintaksisi üçün seriallaşma xarakterikdir: cümlədə fellərin sırası növlərə görə bir-birinin ardınca düzülür və bu zaman subyekt və obyekt yalnız birincidə ifadə olunur. Yazısı latın qrafikası əsasındadır.

## İstinadlar


1. Ethnologue (https://www.ethnologue.com/language/aka) — 19 — Dallas, Texas: SIL International, 2016.


## Mənbə:


"Akan dili". *Azərbaycan Milli Ensiklopediyası: [25 cilddə]*. I cild: A – Argelander (25 000 nüs.). Bakı: "Azərbaycan Milli Ensiklopediyası" Elmi Mərkəzi. 2009. səh. 231. ISBN 978-9952-441-02-4.

